# Müqəddimə

**İslama qarşı cəbhə alanlar**, Qurani-Kərimin qlobal gücləri təhdid edən, dirildən, hökm edən xüsusiyyətini yanlış təvillərlə yox etmək üçün, Quranın izahı mahiyyətində olan Allah Rəsulunun ﷺ Sünnəsini aradan qaldırmaq adına ciddi şəkildə səy göstərməkdədirlər. Bu fəaliyyətə "Quran müsəlmanlığı" adını verərək müsəlmanları bu mübarizəyə qatmağı, xaricdən olduğu kimi, **içəridən də İslamı vurmağı hədəfləyirlər. Fərqli aspektdən Sünnəyə yönəldilən tənqidlərlə**, Qurani-Kərimin Sünnəylə olan bağı qoparılmaqdadır. Beləcə hər kəsin Qurani-Kərimi öz istəklərinə **görə** anlamasına zəmin hazırlanır.

Oryantalizm İslamla birbaşa mübarizə edərək irəliləmədiyini gördükdə, **Sünnəni rədd edən "Quran Müsəlmanlığıyla" İslamı yox etməyə çalışır. Birbaşa Allah Rəsulunu ﷺ tənqid etməklə, müsəlmanların nifrətini öz üzərlərinə çəkəcəklərini bildikləri üçün, səhih hədisləri Allah Rəsulunun ﷺ hüququnu qoruyurmuş kimi görünərək, rədd edirlər.**

Allah-Təalanın Qurani-Kərimi Peyğəmbərimizə ﷺ nazil etməsi, əslində Peyğəmbərimiz vasitəsilə bu kitabın insanlara izah olunması həqiqətini də özündə daşımaqdadır. "Bəyan" vəzifəsinin Allah Rəsuluna verilməsi, Qurani-Kərimin də açıqlanmağa möhtac olduğu həqiqətini ehtiva edir. Quranla Sünnənin "Bəyan münasibəti" məzmununda zikr edilməsi, biri kimi digərinin də ilahi qoruma altında olduğunu tələb edir. Ayədə keçən "zikr" sözü ümumi mənada ələ alındığında, Allahın qorunmasını vəd etdiyi risalət, ya da İslam şəriəti olaraq aydın olur. Necə ki, Allah-Təalanın kafirlərin xoşuna gəlməsə də tamamlayacağını vəd etdiyi "nurullah" tərkibi "İslam şəriəti" mənasındadır. Hər nə qədər bəzi təfsirçilər ayədə keçən "zikr" sözündən Qurani-Kərimi anlasa da, bu vəziyyət Allah azzə və cəllənin Sünnəni qorumayacağı mənasına gəlmir. Çünki Qurani-Kərimlə əməl edilməsi başa düşülməsinə,

başa düşülməsi də Sünnənin varlığına bağlı olduğuna görə Quranın "mübəyyini" (açıqlaması) olan Sünnənin də, Quran kimi qorunması lazımdır. Çünki bəyan edilənin qorunması, **bəyan edənin doğru bir şəkildə mühafizə edilməsinə bağlıdır. Qurani-Kərim ancaq** Allahın istədiyi şəkildə başa düşülərsə qorunmuş olar. Əks təqdirdə təhrif edilmiş olur ki, heç bir şəkildə təhrif qorunma əhatəsinə girmir.

Qurani-Kərimin anlaşıla bilməsinin Sünnəyə olan ehtiyacını yaxın planda müşahidə edən Səhabə Kitabın Sünnə tərəfindən açıqlanan heç bir istiqamətinin bağlı qalmaması üçün Allah Rəsulunun ﷺ yeməyindən içməsinə, oyaq halından yuxusuna, oturmasından qalxmasına kimi həyatın**ın bütün** incə nöqtələrini **rəvayət etdi. Necə ki**, **hədis məcmuaları Səhabənin heç bir detalı keçmədən**, Allah Rəsulundan sadir olan hər şeyi rəvayət etdiyi hədislərlə doludur.

Qurani-Kərimin raviləri olan Səhabə, eyni zamanda Sünnənin də ravisi olma vəzifəsini boynuna götürmüş, bir-birilərini sorğulayaraq Səhabənin ədalətilə əlaqəli bütün şübhələri qaldırmışlar. Çünki, başda Hz. Ömər (r.a) olmaqla Səhabənin hədis sorğulaması həmişə bəraatlə nəticələnmiş, həmçinin sonrakı dövrlərdə ediləcək ittihamlar böhtan daxilində qiymətləndirilmişdir.

Allah Rəsulunun hədislərinə fikir vermədən, Sünnəyə baxmayaraq hökm verənlər, "Nə üçün belə edirsiniz?" sualı ilə qarşılaşdıqlarında öz **arzu və istəklərinə uyğun gəlməyən hədislər mütəvatir dərəcəsində olsa** da belə, uydurma olduqlarını iddia edə bilirlər. Bu vəziyyətdə ağla belə bir sual gəlir: Quran müsəlmanları "Niyə Səhabənin rəvayət etdiyi Sünnəni inkar edir də, onların nəql etdiyi Quranı qəbul edir.? Onlar Qurani-Kərimi rəvayət edərkən etibarlı, hədisləri nəql edərkənmi -əstağfirullah- xəyanət içərisindədirlər?! Onların hər bir nassı mühafizə etmə metodu eyni deyil mi? Qurani-Kərimi mühafizə edərkən müvəffəqiyyətli olanlar, **nə üçün Onun mübəyyini (açıqlaması) olan və qorunması özünün mühafizəsinə bağlı olan Sünnəni**, əzbərləmə nöqtəsində aciz qalsınlar?!

Qurani-Kərimin tarixi proses içərisində məruz qaldığı hücumların ən təhlükəlilərindən olan Sünnəni rədd edən Quran müsəlmanlığı, bu gün gəldiyi nöqtə etibarilə Ümmətdən, O Ümməti var edən İslam mirasından şübhə edər hala gəlmişdir. Məsələnin ciddiliyini görüb elm üçün yollara düşən minlərlə tələbələrdəndən bir qardaşımız, **dərsləri arasında bizim mövzu ilə əlaqəli yazılarımızın bir qismini Azə**rbaycan dilində, siz can qardaşlarımla görüşdürdü.

Səhabə zamanında İslamla tanış olan və əsrlərdir də elə qalan Azərbaycana və oradakı insanlığın üz ağı olmağa namizəd gənc qardaşlarıma sevgilərimi ərz edərkən, onlara bu əsərin çatması üçün xeyli məşğul olan tələbə qardaşıma da təkrar sevgilərimi ərz edirəm.

**İhsan ŞENOCAK**

# 1- MUSTAFA İSLAMOĞLU VƏ QƏTL EDİLƏN KÖRPƏLƏR

Əhli-beyt ən şərəfli mənsəbə daxildir. Amma onlar ülvi olanı süfli olanla dəyişməyi heç düşünməmişlər. Faiz, kölələşdirən sahələrin sərvətinə sərvət qatan cahilliyə iqtisadi sisteminin əsaslarından biri idi. Allah Rəsulu ﷺ belə bir mühitdə ilk olaraq əmisi Abbasın faizini ləğv etdi. Cahilliyədən qalma qan davalarını sonlandırarkən də, yenə ilk olaraq Rəbiə b. əl-Haris b. Əbdülmüttəlibin qan davasını sülhlə nəticələndirdi. Zəkat kasıbların ümidi oldu. Kasıblar zəkatla təməl ehtiyaclarını ödəmək imkanına qovuşdular. Lakin Allah Rəsulu ﷺ Əhli-beytə zəkat almağı qadağan etdi. Bütün təkidlərə baxmayaraq Kəbə xidmətlərindən olan hicabəni (Kəbənin baxımı, qapısının və açarlarının mühafizəsi vəzifəsini) ailəsinə vermədi. Xidmət vasitəsi olan Siqanı (Məkkəyə gələn hacılara su tədarük etmək vəzifəsini) ailəsinə, Kəbənin açarını da Osman b. Talhaya təqdim etdi.

Mədinədə səhabələrin yaşayış tərzi yüksəlincə Əhli-beytin bir hissəsi olan Allah Rəsulunun ﷺ xanımları da bundan nəsibini almaq istədilər. Qurani-Kərim onları kasıblığı seçib Peyğəmbər yanında qalmaqla, ayrılıb firavan bir həyat yaşamaq arasında sərbəst buraxdı.[1] Əzvacı-təhirat, (Peyğəmbərin həyat yoldaşları) məhdud imkanlar və çətin şərtlər altında Allah Rəsulu ﷺ ilə birlikdə olmağı üstün tutdular. Hz. Fatimə (r. anhə) Mədinəyə xidmətçi gəldiyini eşidəndə atasının yanına gedib dəyirman daşı çevirməkdən əllərinin, su daşımaqdan da çiyinlərinin yara olduğunu bildirərək xidmətçi istədi. Allah Rəsulu ﷺ xidmətçiləri Bədir yetimlərinə verdi, qızı Fatiməyə (r. anhə) isə təsbeh, həmd və təkbiri tövsiyə etdi. Hz. Əbu Bəkir (r.a) xəlifə olduqda Hz. Əli (r.a) heç bir haqq iddia etmədən ona beyət etdi. Hz. Əbu Bəkir (r.a) və Hz. Ömərin

1. Əhzab, 33/28-29.

(r.a) müşavirə heyətində öz yerini aldı. Hz. Ömər (r.a) Şama gedərkən dövlət başçılığı vəkalətini ona tapşırdı.[2]

Hz. Əbu Bəkirin (r.a) vəfatı, Hz. Ömərin (r.a) də şəhadətindən sonra Hz. Əli (r.a) iki ayrı xütbə verərək onları xeyirlə yad etdi.[3]

## Əli aranızdadırmı?

Quldurlar Mədinədə böyük bir topluluqla Xəlifə Hz. Osmanın (r.a) evini mühasirəyə aldılar, içəriyə su girməsinə belə icazə vermədilər. Mühasirə zamanı Xəlifənin ağlına ilk olaraq Əhli-beyt gəldi. Buna görə evinin damına çıxıb topluluğa: "Əli (r.a) aranızdadırmı?" - deyə soruşdu, "xeyr" cavabını alanda "yaxşı, bəs Sad aranızdadırmı?" - deyə soruşdu. Yenə eyni cavabı aldıqda susdu və bir müddət sonra "Aranızda bu vəziyyəti Əliyə çatdıracaq biri yoxdurmu?" - deyə soruşdu. Hz. Əli (r.a) hadisədən xəbərdar olduqda Hz. Osmana (r.a) üç tuluq su göndərdi. Suyu içəri keçirmək çətin oldu. Bu müddətdə Haşimoğulları və Bəni Üməyyədən çox sayda adam yaralandı. Hz. Osmanın (r.a) qətl ediləcəyi xəbəri ortalıqda yayılanda Hz. Əli (r.a) oğulları Hz. Həsən və Hz. Hüseynə "QILINCLARINIZLA BİRLİKDƏ GEDİN, OSMANIN QAPISINDA GÖZLƏYİN, İNSANLARIN ONA ZƏRƏR VERMƏSİNƏ İCAZƏ VERMƏYİN" - buyurdu.[4] Quldurlar tərəfindən mühasirəyə alınan evin qapısında Əhli-beyt keşik çəkdi. Hz. Həsən atılan oxla yaralandı. Bütün bunlara baxmayaraq Əhli-beyt, Hz. Osmanı (r.a) üsyançılara təslim etmədi, müqavimət göstərdi. Quldurlar evə qapıdan girə bilməyəcəklərini anlayıb arxadan dolanıb divara dırmaşdılar və damdan içəri girib Hz. Osmanı (r.a) Qurani- Kərim oxuyarkən şəhid etdilər.[5]

---

2. Ət-Təbəri, IV, s, 203-204.
3. Əbul-Həsən ən-Nədvi, *Surətani Mutəzəddətani,* s, 42.
4. Suyuti,*Tarixul-Xuləfa*, s, 159.
5. Ən-Nədvi, *e. a. ə.,* s, 44.

## Niyə Əli?

Hz. Osman (r.a) mühasirə altında ilk olaraq Hz. Əlini (r.a) xatırladı. Çünki Allah Rəsulu ﷺ əshabıma pis söz deməyin[6] buyurduğunda Hz. Əli Ona hər kəsdən daha yaxın idi. İttibada (təslimiyyətdə) da öndə idi. Buna görə Hz. Osman (r.a) kütləyə “Əli aranızdadırmı?” - deyə soruşdu. Əhli-beyt Ümmətin birləşməsi üçün çətin zamanlarda geri addım atdı. Onlar heç bir zaman Peyğəmbərə nəsəbcə yaxın olmaqlarından, dünyəvi məqsədlər üçün istifadə etmədilər. Həsən b. Əli bir gün bazarda ehtiyacı olan bir mal üçün dükan sahibi ilə bazarlığa girişdi. Satıcı malın bazar qiymətini dedi. Daha sonra həmsöhbətinin Allah Rəsulunun ﷺ nəvəsi olduğunu öyrənəndə hörmət hissi ilə malın qiymətini aşağı saldı. Hz. Həsən "Dünyalıq bir şey üçün Allah Rəsuluna ﷺ yaxınlığımdan faydalanmağı qəbul etmərəm" - deyərək təklifi rədd etdi. Zeynəlabidin də Allah Rəsuluna ﷺ yaxınlığı səbəbi ilə ona bir şey verilməməsi üçün özünü gizləyərdi.[7]

## Yəhudi amili: İbn Səbə

Allah Rəsulu ﷺ vaxtında dəfələrlə fitnə yolunu açmağa çalışan, ancaq müvəffəq ola bilməyən yəhudilər Hz. Ömərdən (r.a) sonra ortaya atıldılar. Peyğəmbərin şərəfli nəsəbinə aid olmağın adı olan Əhli-beyt yəhudilərin müdaxiləsi ilə öz mənası xaricində yeni mənalarda işlədildi. Yəhudilər ümmətin böyük bir tərkibini qoparan bu əməllə təkbaşına bütün parçalanmaları şeytani bir zəkayla yerinə yetirdiklərini bir daha göstərdi. "Əli tərəfdarlığı" adı altında yaşanan bu parçalanmanın baş memarı Yəmən yəhudisi Abdullah bin Səbədir. İbn Səbə, Hz. Əli (r.a) ilə Hz. Müaviyə arasındakı ixtilafı müharibəyə çevirmək üçün xeyli güc sərf etmiş, ancaq Hz. Əlidən (r.a) üz görməmişdir. Hətta Hz. Əliyə (r.a) "sən ilahsan" demişdir. Bunungla da Hz. Əlinin (r.a) əmri ilə Mədainə sürgün edilmişdir.

---

6. Buxari, 3673.
7. İbn Kəsir, *əl-Bidayə,* IX, s, 106.

İbn Səbə getdiyi yerlərdə boş durmadı, məcusilərlə ittifaq qurdu. Yəhudi və məcusi ittifaqı fitnəyə böyük yol açdı. Əməvilərin xətaları da bu məcranı yüksəltdi. İki məğlub millət İslam səfində durub Hz. Əli (r.a) üzərindən tərəfdar topladı. Ümmətin bütünündən ayrılan bu parçaya daha sonra "Əhli-beyt məzhəbi” deyildi.

## Təqiyyə Strategiyası

Şiə böyümə müddətini təqiyyə strategiyası ilə idarə etdi. Quranla da əlaqələndirdiyi bu anlayışı[8] beşinci imamlarına istinad edilən bir sözlə təsdiq etdilər: "ət-Təqiyyə dini və dinu əbai və lə iman limən lə təqiyyə ləhu (Təqiyyə həm mənim, həm də atalarımın dinidir. Təqiyyəsi olmayanın dini də yoxdur)".[9]

Şiələr bununla dəvətə başlayarkən çoxtanrılı sistemi kəlimeyi-tövhidlə rədd edən Allah Rəsulunun ﷺ tərtəmiz yoluna “təqiyyəni” bulaşdırdılar.

Təqiyyə ilə həqiqi niyyətini gizləyən şiələr hər dövrdə İslama yönələn təhdidlərin bir parçası oldu. Su ilə balığı vuruşduracaq qədər fitnə mütəxəssisi olan yəhudilər İslam dünyasındakı bir çox bölünməni şiələr üzərindən icra etdi. Təəssüf ki, şiələr də buna fürsət verdilər. Onlar İslam coğrafiyasını zəbt edəndə monqolların, Səlahəddinin fəth ordusuna qarşı səlibçilərin, Suriya fransızlar tərəfindən işğal ediləndə də müstəmləkəçilərin tərəfində iştirak etdilər.

## Xomeyni

İslam dünyası müasir dövrdə Xomeyni ilə "İran İslam Respublikası"na şahid oldu. Xomeyni "İslam hökumətinin başçısı", "Ğaib imamın naibi" ünvanları ilə ümmətin tamamını əhatə edən fikirlər səsləndirdi. Bir qrupun deyil, ümmətin mənfəətlərini qoruyacağını bildirdi. Bütün İslam coğrafiyasında mülayim ab-hava meydana gəldi. Xomeyni birlik

8. Ali-İmran, 3/28.
9. Əl-Məvsuafil-Ədyan, I, s, 54.

fikirləri səsləndirərkən Sünnə və Camaat əqidəsinə bağlı alimlər: “Xomeyninin bu hücumunun şiələr üçün bir islahatmı, yoxsa yeni bir təqiyyəmi" - olması haqqında düşündülər, lakin sui-zənn olmasın deyə onun haqqında mənfi bəyanat vermədilər. Bəzi jurnalistlər baş verənlərdən yaxından xəbərdar olmaq üçün İrana gedib-gəldilər. Gedib-gələnlərin isə qənaətləri müxtəlif idi. Alimlər Xomeynini anlamağa çalışdığı müddətdə susmağa davam edərkən, İransevərlərin nəşr etdiyi məcmuə və kitablar hər yerdə şiələrin təbliğatını gücləndirirdi. Xomeyninin xaricə yönəlmiş İslam birliyi mesajları müsəlman gənclərdə böyük bir həyəcan oyandırdı. Sünnilər tarixdə ilk dəfə bir Ayətullaha "İmam" dedilər: "İmam Xomeyni". Bu ifadə onun siyasi mesajlarının sünnilər tərəfindən də ictihad olaraq qəbul edildiyi mənasına gəlirdi. Təqiyyə Xomeyninin qalxanı idi. Kitabları başqa dillərə çevrilirkən Əhli-Sünnəyə zidd fikirlər tərcümə olunmurdu. Beləliklə, Xomeyni sünni müsəlmanlar arasında səhabələrə söyməyən Ayətullah olaraq tanındı və sevildi. Halbuki həqiqi Xomeyni, təbliğatı edilən Xomeynidən çox fərqli idi. Nəşr etdiyi kitablar əvvəlki Ayətullahlardan yalnız adının fərqli olduğunu göstərdi. “Kəşful-Əsrar” adlı kitabında səhabələri dini dünyəvi məqsədlərinə, Qurani-Kərimi də fasid niyyətlərinə vasitə edən, şiələrin imamətinə qarşı çıxan, Hz. Əlinin (r.a) xilafətinə dəlalət edən ayələri Qurandan çıxaran bir qrup olaraq xarakterizə edirdi.[10]

İslam Dünyasında Xomeyni sevgisi məhəbbət korluğu meydana gətirdi. Onların İslamı birləşdirmək fikri, təqiyyə sənəti və Kərbəla hadisəsi haqqındakı düşüncələri intiqam almağa hazır insanların yetişməyinə səbəb olmuşdur. Kərbəla ilahiləri, ya da səhabəyə lənət cümlələri ilə böyüyən uşaqlar sünniləri Hz. Hüseyni şəhid edən Yezid kimi gördülər. İranpərəst lobbinin təsiri ilə "Kərbəla" mövzusu gündəmə gətirildi. Televiziya vaizlərinin daha çox reytinq qazanmaq üçün həmişə Kərbəla mövzusundan danışması insanlardakı Əhli-Sünnə həssaslığını zədələdi. Halbuki alimlər "Kərbəla"

---

10. Xomeyni, *Kəşful-Əsrar,* s, 114; Ən-Nədvi *e. a. ə.,* s, 53.

kimi hadisələrin ümmət arasındakı ixtilafı daha da dərinləşdirəcəyini bilərək dərs halqaları xaricində danışılmasını doğru görməmiş, "Allah bizi o dövrdə yaşatmayıb əlimizi qandan qorudu, biz də dilimizi qoruyaq "demişdilər. Əfsus ki, ekran vaizləri və islamşunaslar qədim olan hər şey kimi, bu təsbiti də rədd etməyi müasir olmağın bir şərti saydılar. Beləcə İranda yeni şiəlik imici ilə intiqam virusuna mübtəla, xəstə ruhlar yetişdi. Monqolların, səlibçilərin dünən edə bilmədiyi qırğınları, bu gün İran Hizbullah və Əsəd güclərindəki radikal insanlar etməkdədir.

## Mustafa İslamoğlu

Mustafa İslamoğlu danışıqlarında şiəliyi "Əhli-beyt məzhəbi" adlandırır və onların dəlalət əhli olduqlarını iddia etməyin səhv olduğunu deyir.[11] Qurani-Kərimin "ikinin-ikincisi" olaraq xarakterizə etdiyi Hz. Əbu Bəkirə (r.a) Allah Rəsulunun ﷺ "Əgər məndən sonra peyğəmbər gəlsəydi, Xəttab oğlu Ömər olardı" - dediyi Hz. Öməri (r.a) təhqir edən, iffəti Quranın bəyanı ilə sabit olan Hz. Aişəyə zina isnad edən insanların meydana gətirdiyi birliyə "Əhli-beyt məzhəbi" demək, ifadələrinin Əhli-Sünnədən daha mötəbər olduğunu iddia etməkdir. Çünki Qurani-Kərim Əhli-beytin günah əlaqəsinin digər insanlardan fərqli olduğunu ifadə edir.[12]

İslamoğlunun "Əhli-Sünnə" və "Əhli-beyt" təsnifini qəbul edən bəzi insanlar bir müddət sonra "Əhli-beyti" Allah Rəsuluna ﷺ daha yaxın görməyə başladı. Şiələrə məhəbbətdən hasil olan bir korluqla səhabələrin rəvayət etdiyi hədislərə şübhə ilə yanaşır, boş sözlər olaraq görməyə başladılar. Təəssüf ki, bu məhəbbət korluğu bu gün bəzi müsəlmanları Suriyadakı İran və Hizbullah qırğınına siyasi səbəblər uydurmaq axtarışına sövq etmişdir. İslamoğlunun "İranın təzkiyə məmuru" olduğunu iddia  etmirik. O, özünü necə tanıdırsa elədir. Lakin ifadələri vəzifəli bir təzkiyə məmurunun şərhləri

11. Bu dəlil burdan alınmışdır: http://www.youtube.com/watch?v=jT-kEM0vWUaY.
12. Əhzab, 33/33.

kimidir. Təəssüflər olsun ki, çətin zamanlarda Hz. Osmanın (r.a) qapısında gözləməyi İslami bir vəzifə hesab edən Əhli-beyt adı İslamoğlunun dilində səhabələri söyən, Banyasda (Suriyada bir bölgədir) adı Əbu Bəkir (r.a), Ömər (r.a), Osmandır (r.a) deyə boğazları kəsilərək öldürülən körpə qatillərindən ibarət birliyin adına çevrilmişdir. Əgər Hz. Əli (r.a) bu gün həyatda olsaydı, şübhəsiz ki, Hz. Osman (r.a) məsələsində olduğu kimi yenə oğullarını Suriyada, İraqda şiələr tərəfindən şəhid edilən məzlum müsəlmanları qorumaq üçün göndərərdi. Sabah böyük məhkəməyə səhabələr, Banyasda ağzındakı əmziklə qətl edilən Ömərlər, Əbu Bəkirlər, əhli-bidət olan şiələr və onları təzkiyə edərək etdiklərini qanunilәşdirən İslamoğlu da gələcək. Hər kəs etdiklərinin, etməsi lazım gələndə etmədiklərinin, söylədiklərinin, söyləməyi lazım olarkən söyləmədiklərinin hesabını verəcək.

Əhli-Sünnəni tənqid edən və şiəliyi tərifləyən Mustafa İslamoğlu, bunu bizim yanımızda eləsə onun tənqidlərinə layiqli cavab verərdik.Lakin bu ifadələr xalqa açıq məclislərdə dəfələrlə danışıldı və müqayisədən aciz bəzi müsəlmanlar tərəfindən qəbul edildi. Nəticədə Əhli-Sünnə alimlərinə qarşı bir etibarsızlıq meydana gəldi. Dinləyicilər arasında Əqidə, Fiqh, Təfsir, Hədis məcmualarına qədər İslamdan şübhə edən mübtədilər (bidətçilər) tayfası zühur etdi.

## 2- MUSTAFA İSLAMOĞLUNUN FİKİR KÖLƏLİYİ LAYİHƏSİ

Bu yazını İslam qardaşlığı naminə və bir müsəlmanın "əmri-bil-məruf" vəzifəsini yerinə yetirmək çərçivəsində qələmə aldım. Mustafa bəy! Hər hansı məsələyə açıqlama verərkən istifadə etdiyiniz Əhli-Sünnəyə görə belə, Əhli-beytə görə belədir şəklində dedikləriniz sizi təqlid edənlər nəzdində İslamın əsasında biri digərinin alternativi olan iki yol olduğu şəklində başa düşülür. Əhli-Sünnə alimlərini təhqir etmək və şiə alimlərini tərifləməklə "Əhli-beyt" adı altında şiəliyi tabe oluna biləcək məzhəb kimi göstərməkdir.

Bir "Quran müsəlmanı" olaraq Əhli-beytin Allahın kitabında Peyğəmbərimizin ailəsi mənasında işləndiyini yəqin ki, bilirsiniz. Buna baxmayaraq "Əhli-beyti" təhqir edən şiəliyi bu şəkildə təsmiyə etməyiniz doğru deyildir. Çünki müsəlmanlar tərəfindən bu yazılar yalnış başa düşülür.

### Əhli-Sünnə İslamın Özüdür

Mustafa bəy! Məlum olduğu kimi Əhli-Sünnə hər hansı bir alternativ deyil, Əhli-beyti də əhatə edən kökdür. İslamın özüdür. O, səhabələrə Allah Rəsulundan ﷺ miras qalmışdır. İbn Teymiyyə mövzuya dair bunu deyir: "Əhli-Sünnə, Allah-Təala Əbu Hənifəni, Maliki, Şafeini və Əhməd b. Hənbəli yaratmamışdan çox əvvəl var olan məzhəbin adıdır".[13]

Allahın elçisi "Təriqəti-Naciyədən" (xilas olan firqədən) bəhs etdiyi bir hədisində özünə yönəldilən suala cavabında xilas olanların "Özü və səhabələrinin mənimsədiyi yolda səbat göstərənlər" - olduğunu ifadə etmişdir.[14]

Buna görə "xilas" olanlar zərurəti-diniyyə daxilində qiymətləndirilən əsasları qəbul edərək səhabə yolu üzərində

13. İbn Teymiyyə, *Minhəcus-Sünnətin-Nəbəviyyə*, II, 266.
14. Tirmizi, İman, 18.

olanlardır.[15] Səhabələr də bu anlayışı eyni çərçivədə istifadə etmişdir. Necə ki, İbn Abbas: "**Bəzi üzlərin ağ, bəzi üzlərin isə qara olacağı gündə (qiyamət günündə), üzü qara olanlara: "İman gətirəndən sonra kafirmi oldunuz? İndi, kafir olduğunuza görə dadın əzabı!" – deyiləcəkdir**"[16] ayəsini təfsir edərkən, üzləri ağ olan kəslərin "Əhli-Sünnə vəl-camaat" olacağını bildirmişdir.[17] Tabeundan Əyyub əs-Səxtiyani (ö. 131), ətbəut-təbiindən də Süfyan əs-Səvri (ö. 161) başda olmaqla bir çox alim Əhli-Sünnə anlayışını eyni mənada işlətmişlər.[18] Xarici ünsürlərin təsiri ilə Hz. Osman dövründə ortaya çıxan fitnələr xaricilik, şiəlik və mötəzilə məzhəblərinin ortaya çıxmağına səbəb oldu. (əl-Mubarəkfuri, Tuhfətul-Əhvəzi, VII, 54) Bu parçalanmadan sonra ümmətə aid məsələləri yazmaq ehtiyacı ortaya çıxdı.

Sünnə kəlməsi bidət kəlməsinin, camaat kəlməsi də "ayrılmaq" kəlməsinin antonimi kimi işlədilməyə başlandı. Həmçinin Əhli-Sünnənin İslam əsaslarını kənar təsirlərdən qoruyan məfhum kimi formalaşmağına zəmin hazırladı. Bir mənada sünnə və camaat məfhumları İslamdan ayrılan xarici, şiə, rafizi və qədərilərdən ayrıldı.

Zaman keçdikcə fitnə və bidət əqidəvi və ictimai mənada qarışıqlıq və əleyhdarlıq, Sünnə Allah Rəsulu ﷺ kimi inanıb yaşamaq, Camaat isə ayrılmadan bir yerdə qalmaq kimi başa düşüldü. Sünnə və Camaatın bidət və fitnə ilə tam bir ziddiyət içərisində olması tarix boyu davam etdi. Bu məfhumlar Əhli-Sünnə və Əhli-bidət məzhəbləri olaraq adlandırıldı. Modernist müsəlmanlar tərəfindən kənarlaşdırma olaraq qəbul edilib tənqid olunan bu təsnif, insanların hansı ölçüləri əsas alaraq müstəqim olacaqlarını, harada, nə üçün lazım olduqlarını təsbit etmək imkanı yaratdı. Əhli-Sünnəyə Qurani-Kərim və Sünnə bütövlüyü içərisində formalaşan,

---

15. Kövsəri, *İftiraqul-Ümmə aləl-Firaq,* 6.
16. Ali-İmran, 3/106.
17. Qurtubi, IV, 107.
18. Suyuti, *Miftəhuəl-Cənnət*, 46

səhabələr tərəfindən də yaşanan İslam olaraq tərif vermək mümkündür. Necə ki, məzhəblərin quruluş dövründəki müctəhidlərin Əqidə və Fiqh məclislərindəki bəyanlarından Əhli-Sünnənin İslamda bir bölünmə olmadığı, əksinə həyatı Qurana və Sünnəyə görə təyin etmək olduğu aydın olur. "Əhli-Sünnə" İslam içərisində yeni bir məzhəbin adı deyil, Allahın nazil etdiyi dinin özüdür.

## Tənqid insaf sərhədini keçəndə

Əhli-Sünnə İslamın özü olduğuna görə xüsusən də ona yönəldilən hər bir tənqid İslama aiddir. İslami elmlərə yad, alimlərin elmi və fikri izahlarından məhrum olan bəzi qardaşlarımız sizin zaman-zaman insaf sərhədini aşan tənqidlərinizin təsiri ilə kiçiyi böyük, böyüyü kiçik görmək xəstəliyinə tutuldular. Türkiyədəki bütün mötəbər camaatlar Əhli-Sünnə alimlərinə ehtiram göstərirlər. Buna baxmayaraq sizdən təsirlənən bəzi qardaşlarımız sələf alimlərimizi kiçik görür, ya da sultanların müdafiə məmuru adlandırırlar. Mustafa bəy! Bunu etməyə haqqınız yoxdur. Təqiyyəni dinin əsası qəbul edən şiəliyə “Əhli-beyt" deyib, onları təzkiyə edərkən Allahın şəriətini qorumaq üçün dar ağaclarına meydan oxuyan Əhli-Sünnə alimlərini alçalda bilməzsiniz. Bir "televiziya müəllimi" olaraq ömürlərinin bir hissəsini cihad meydanlarında keçirən Rəbbani alimlər haqqında "onların yaxasına yapışaram" kimi ifadələr işlədə bilməzsiniz. Bu ən yüngül ifadə ilə həddini bilməzlikdir. Mustafa bəy! Ümumi mənada camaatlar "ittihadi-İslam" həssaslığını mühafizə etdi və onu qəbul edənlərə də bunu aşıladılar. Lakin siz zahirdə ümmət həssaslığından bəhs edərkən, Əhli-Sünnəyə aid tənqidlərinizlə Rafizilərin yolunu açdınız.

Mustafa bəy! Sizin vasitəçiliyinizlə ümməti təşkil edən bütündən (Əhli-Sünnədən) ayrılma meydana gəldi. Əhli-Sünnə alimlərinə və onların müəllifi olduğu kitablara qarşı inam azaldı. Artıq sizi dinləyənlər nə Əbu Hənifəyə, nə də Buxariyə etimad edirlər. Mübtədi (bidətçi) birinin tərcüməsini, müctəhid əsərlərindən daha üstün görürlər. Sizdən, ya da

sizinlə eyni prizmadan baxanlardan öyrəndikəri ilə xəbərsiz olduqları bir çox ideoloji, fiqhi, əqidəvi mövzulara etiraz edir, alimləri alçaldırlar. Bir çox mövzuda onların fitvaları ilə əməl etmələrinə baxmayaraq  məzhəbsizliyi müdafiə edirlər.

## Elm saraylarından ibtidai elm çadırına

Mustafa bəy! Təəssüf ki, sizin sayənizdə "Əhli-Sünnəni" xurafatlar məcmuəsi olaraq görən təəssübkeş insanlar yetişdi. Madam ki, bu qardaşlarımızın sizə etimadları tamdır və bu yolun bələdçisi sizsiniz, bu təqdirdə onlara Əhli-Sünnənin nə demək olduğunu izah edin. Fiqhdən bir fəsli təqrir səlahiyyətinə malik olmayan, lakin "bilmədiyini bilməməyindən" cəsarətlənərək tərcümələrdən hökm çıxaran qardaşlarımıza harada dayanmalı olduqlarını, onları bu hala gətirən siz olduğunuz üçün əvvəla sizin xatırlatmağınız lazımdır. Əfsuslar olsun ki, bu gün elmlə məşğul olan  bir çox nüsəlman  bir çox İslami elmlər haqqında hökm bəyan edir. Ömründə bir dəfə Buxarini görməyən, nəyə mətn, nəyə sənəd deyildiyini bilməyənlər, eşitdikləri hər hədisin səhih olub-olmadığını müzakirə edirlər. Onların nəzərində nə üsul, nə cərh nə tədil, nə şərh, nə təfsir, nə qayda, nə məqasit kitablarının bir qiyməti var. Nəsxdən şəfaətə qədər Əhli-Sünnənin varlığında icma etdiyi bir çox mövzunu sizin kimi xurafat görürlər. İslamı yaşamaq üçün hər cür fədakarlığı gözə alan, lakin tənqidlərinizin təsiri ilə mədəniyyətin elm saraylarına girməkdən çəkinən, bəlkə də təkəbbürlük edən bu müsəlmanlar, sayənizdə son dərəcə ibtidai elm və fikir "çadırlarına" məhkum oldular.

## Fikir köləliyi

İslamı yaşamaq məqsədi ilə sizin yazılarınızı oxuyan və ya dinləyən qardaşlarımızın səmimiyyətinə şübhəmiz yoxdur. Onlar haqqında narahatlığımız orta səviyyədə ifadə qabiliyyəti olan bir bidətçini müctəhid hesab etmələri və onun Əhli-Sünnəyə zidd fikirlərinə tabe olub icmaya qarşı çıxmalarıdır. Təəssüf ki, görüşlərinizə məhkumluq onları Fiqh, Təfsir və Hədisdən məhrum etmişdir. Siz də sanki bu məhkumiyyə-

ti davam etdirmək, "fikir köləlәri" yaratmaq üçün xüsusi bir səy göstərirsiniz.

Qardaşlarımızın söhbətlərinizə, ya da yazılarınıza davamlılıq yolu ilə yaranan məhrumiyyətlərini və dərhal sonra gələn "fikri köləliyini" bir-birinə zidd iki örnəklə açıqlayım: Bu yaxınlarda Beydavi və Nəsəfini mütaliə etmədən oxuyub anlaya biləcək səviyyədə ərəb dili bilən bir qrup Afrikalı şagirdlər ziyarətə gəldilər. Fakultədəki tədrisdən bəhs edərkən müəllimlərindən bəzilərinin, "qədər", "Nüzulu-İsa", "Qəbir Əzabı", "Şəfaət", "qadınların xüsusi hallarda namaz qıla bilməyəcəyi" kimi bir çox məsələni inkar etdiklərini dedilər. Bunları qəbul edib-etmədiklərini soruşdum. Hamısı birdən, əlaqədar ayə və hədislərlə müəllimlərin fikirlərini rədd etdiklərini bildirdilər. Lakin eyni vəziyyət İmam Xətibi oxuyub ilahiyyat fakültəsinə qəbul olan qardaşlarımıza şamil edilə bilməz. Çünki onlar məsələləri ilk dəfə ilahiyyatda eşitdiyindən, doğru ilə yanlışı ayırd edə bilmirlər. Sizin "kitablarınızı" oxuyan türkiyəli tələbələrin Əhli-Sünnəyə zidd fikirləri qəbul etməyi, Afrikalı tələbələrin isə bunu etməməyi sizin "əməyinizin məhsulu" deyilmi?

Qəribədir ki, təqlidi tənqid etdiyiniz halda həyat boyu sözlərinizi təqlid edəcək fikir köləlәri yetişdirmisiniz".

## Söhbət müəllimliyi israrı

Niyə belə bir yol təqib edirsiniz? Niyə bir dərs halqası qurmadınız? İzləyicilərinizin yeganə məlumat ağacı olma təkidinizin ardında nə var? Əgər bir dərs halqası olsaydı, həmsöhbət kütləni, elmdə müəyyən bir səviyyəyə çatdıqdan sonra Təfsir, Fiqh, Hədis kitablarını oxuyub təhlil edəcək, azad düşünərək fikirlərinizdən xilas olacaq ya da fikirlərinizin bir qismini qəbul eləsə də digərlərini rədd edəcəkdi. Görəsən, tək "öndər" olmaq arzusu idimi sizi söhbət müəllimliyinə məhkum edən? Sizin "kitablarınızı" oxuyan türkiyəli tələbələrin Əhli-Sünnəyə zidd fikirləri qəbul etməyi, Afrikalı tələbələrin isə bunu etməməyi sizin "əməyinizin məhsulu" deyilmi? Bəlkə oxutmağa gücünüz yetmədiyinə, elminizin

azlığına, İslam elmlərini bilən tələbələrin sizi sorğulayacağını düşündüyünüzə görə onlara əsas mənbələri oxutmamısınız?

Bütün bunların cavabını bir Allah azzə və cəllə, bir də siz bilirsiniz.

## Münazirə vəsiləsilə

Məlumdur ki, münazərədə məqsəd, həqiqəti ortaya çıxarmaqdır. Mənim və Əbubəkr Sifil xocanın, Əbdüləziz bəylə etdiyi münazirəni dinlədikdən sonra Əbdüləziz bəyin yanındakı bir çox səmimi müsəlmanlar Əhli-Sünnəyə zidd fikirlərdən tövbə etdiklərini bildirdilər. Mustafa bəy! Əhli-Sünnəyə mənsub insanları nəzərdə tutaraq minbərdən sərf etdiyiniz, "Əbdüləziz xocanı çaqqallara yedirmərəm"[19] kimi ədəbdən məhrum ifadələr işlətmisiniz. Lakin Əbdüləziz bəy münazirədə verilən dəlillər qarşısında "Google"dən cavab axtararkən ya da göndərilən elektron poçtlara görə cavab uyğunlaşdırmağa çalışarkən onun tərəfində olmadım, onu müdafiə etmədim.

Yenə Sünnə və Camaat əqidəsinə bağlı müsəlmanları nəzərdə tutaraq, "Əbdüləziz xocanın əməyinə bövl etdilər" dediniz.[20] Bu ifadələrdən istifadə edəni Kitaba inanan "Quran müsəlmanı" adlandırmaq olarmı? Sizi, Əhli-Sünnə müsəlmanlara qarşı bu dərəcə qəzəbləndirən səbəb nədir? Cəmaləddin Əfqani üçün dediyiniz, "Onlar Əfqaninin təharət bezi belə ola bilməz"[21] ifadəsini, Qurani-Kərim oxuyan ağzınıza necə yaraşdırırsınız?

Allaha imanla şərəflənən möminləri, mason və şiə olan Əfqaninin təharət bezi adlandırmağa vicdanınız necə razı oldu? Sizi bu cümlələrdən istifadə etməyə kim vadar edir? Cəmaləddin Əfqaninin şiə olmağımı? Maraqlıdır, Əhli-Sünnə alimlərini təhqir edən lakin kardinala "əlahəzrət" deyə xitab edən, Əbdüləziz bəyin bu halıyla da fəxr edirsinizmi?

---

19. Http://www.youtube.com/watch?v=coSWGFsn8Gg.
20. Http://www.youtube.com/watch?v=u6Asu28zM2o.
21. Http://www.youtube.com/watch?v=ZZRKa7sl_PI.

## Əhli-Sünnə və hesablaşma

Mustafa bəy! Əhli-Sünnə bütün pozğun firqələri, ideoloji və elmi sahədə məğlub etmişdir. Eynilə bunun kimi, hər iki münazirə vasitəçiliyi ilə çox sayda müsəlman həqiqəti görüb, Əbdüləziz bəyin fikirlərinə məhkumiyyətdən xilas oldu. Siz də bu məsələləri kütlə qarşısında danışmaqdan əl çəksəniz yaxşı olar. Bu vəziyyətdə qardaşlıq hüququmuz nəyi, necə etməyi tələb edirsə, onu etməyə hazırıq. Yox əgər Əhli-Sünnəyə müxalifət edərək hal diliylə alimlər sizi səhvə və xurafata məhkum etdi fikrindən dönməsəniz, rafiziliyin önünü açmağa davam etsəniz sizin kimi düşünənlərə Əhli-Sünnənin nə olduğunu başa salmaq üçün rəddiyyələr yazacaq və münazirələrə dəvət edəcəyik.

## 3- QƏRBİN AĞIL OCAĞINDA BUXARLANAN HƏQİQƏT: NÜZULU-İSA (Hz. İsanın nüzulu)

Bir gün dünyanın da sonu çatacaq. İçindəkilərlə birlikdə dünya da yox olacaq. Bu sonsuz tükənişin nə zaman olacağını bilmirik.

Allah Rəsulu ﷺ risaləti müddətində qiyamətin vaxtı ilə əlaqəli suallarla tez-tez qarşılaşırdı. Quran hadisəni belə izah edir: "**(Ya Rəsulum!) Səndən saat (qiyamət günü) haqqında soruşarlar ki, nə vaxt qopacaq? De: "O ancaq Rəbbimə məlumdur**".[22]

Qiyamətin mütləq olaraq bilinməzliyində zehinlərə işlənmək üçün Dihyətul-Kəlbi surətində Nəbinin yanına gələn Cəbrayıl Allah Rəsulundan ﷺ qiyamətin vaxtını soruşduqda O, belə cavab vermişdi: "Soruşulan soruşandan daha yaxşı bilmir".[23] Buna görə qiyamət "Muğəyyəbatı-Xamsə"dən (beş bilinməyən şey) sayıldı. Bunların bilinməsi ilə əlaqəli qapı tamamilə bağlanıb. Quran və Sünnənin tələbi də bu istiqamətdədir.

Hz. İsanın bədəni ilə səmaya qaldırıldığı, qiyamət ərəfəsində isə təkrar yer üzünə enəcəyi adı çəkilən əlamətlər içərisindədir və dəlillər ilə sabitdir. Dəccal, Yəcuc və Məcuc, Dabbətul-Ərz, günəşin qərbdən doğması və Hz. İsanın yer üzünə enişi də dəlillərlə sabitdir.[24] Necə ki, Əllamə Muhamməd Ənvər Şah əl-Kəşmiri, "ət-Təsrih bimə təvatərə fi Nüzulil-Məsih" adıyla qələmə aldığı əsərində Nüzul həqiqətini cəm etdiyi hadisələrin etiraza imkan verməyəcək şəkildə isbat etməkdədir.

Muhamməd Zahid Kövsərinin Hz. İsanın öldüyünü, yer üzünə enəcəyini iddia edən Şeyx Mahmud Şəltutun fitvasına

22. Əraf, 7/187.
23. Müslim İman, 8; Tirmizi, İman, 2738; Əbu Davud, Sünnə, 4695.
24. Səid Ramazan əl-Buti, *Kubral-Yəqiniyyətil-Kəvniyyə,* s. 318.

yazdığı rəddiyəsində adı çəkilən əsəri təsbit və təsdiq edir.[25] Hz. İsanın enəcəyinə dəlalət edən açıq ayələr və mütəvatir hədislər mövcuddur və bu haqda icma var. Buna baxmayaraq Qərb düşüncəsindən təsirlənən XIX əsrdən sonra yaşayan bir çox insan Hz. İsanın enişi ilə əlaqəli qəti hökmə etiraz etdilər. Əslində həmin əsrə qədər nüzul məsələsi insanlar üçün bir problem təşkil etmirdi. Problem nüzuldan sonra Hz. İsanın nə edəcəyi ilə əlaqəli idi. Onlara görə Hz. İsa yeni bir şəriətlə gələcəyi təqdirdə Rasulullahın son Peyğəmbər olmasını rədd etdikdə, müsəlmanların reaksiyasını yoxlayacaqdılar. Hz. İsanın  endikdən sonra Allah Rəsuluna ﷺ tabe olacağını bildirdikdə isə xristian aləmini qarşılarına alacaqdılar. "İbrahimi Dinlər" və onların tərəfdarları insanları xristianlarla paralelel düşünməyə vadar etdi. Buna görə, qələmə aldıqları təfsirdə əhli-kitabın cənnətə girəcəyini iddia etdilər, Rəsullar arasında dərəcə fərqi olduğunu rədd etdilər. Lakin Hz. İsanın enişi mövzusunda əhli-kitabla eyni qənaəti paylaşmadılar. Çünki nüzul edəcək İsanın İslam şəriətinə tabe olması xristianlığın tamamilə nəsx edilməsi mənasını verməkdə idi. Yəni bu ixtilaf onların məşruiyyətinə xələl gətirməmək üçün idi.

## İsanın həyatı

Hz. İsanın göyə yüksəldilməsi və təkrar yer üzünə dönməsi bəhsinin nə ifadə etdiyini, Sünnə və Camaat alimlərinin mənimsədiyi görüşün Quran və Sünnənin açıq bəyanı olduğunu dərindən anlaya bilmək üçün Hz. İsanın həyatını bilmək lazımdır. Çünki Hz. İsanın anası Məryəmdən etibarən yaşadığı həyat onun nüzulunun da qavranmasını asanlaşdıracaq.

İmranın həyat yoldaşı saleh bir qadın idi, qarnındakı övladını Allaha həsr etmişdi. Razılığına uyğun surətdə qəbul etməsi üçün də dua edərdi. Uşaq qız olaraq dünyaya gəldikdə İmranın həyat yoldaşı kədərləndi. Nə edəcəyini bilməyərək

25. Muhamməd Zahid Kəvsəri, *Nəzrətun Abirə fi Məzaimi mən Yunkiru.*

belə dedi: "**Ey Rəbbim mənim qızım oldu**".[26] Düşünürdü ki, Allahın beytinə xidmət və ibadət şərəfi yalnız kişilərə aiddir. Qızlar bunu edə bilməzlər. Xüsusilə də heyzli günlərində. Allah-Təala, saleh qadının övladına, onun şərəfinə görə ad qoydu. Onu Məryəm adlandırdı. Məryəmi saleh ananın əhdi olaraq kişinin yerinə qəbul etdi. Onu gözəlcə tərbiyə etdi. Məryəmin xalasının əri Hz. Zəkəriyyəni onu baxmaqla vəzifələndirdi. Məryəm faydalı elmi, saleh əməli Peyğəmbərdən öyrənərək yetişdi.[27] Hz. Zəkəriyyə Məryəmin yanında qışda yay, yayda da qış meyvələrinin olduğuna şahid olurdu. Uca Allah Qurani-Kərimdə buyurur: "**Belə olduqda, Rəbbi (Məryəmi) yaxşı qəbul etdi, onu gözəl bir fidan kimi böyütdü və Zəkəriyyaya tapşırdı. Zəkəriyya hər dəfə (Məryəmin) ibadət etdiyi mehraba girdikdə, onun yanında bir ruzi olduğunu görərdi. (Zəkəriyya:) “Ya Məryəm, bunlar sənin üçün haradandır?” - dedikdə, o: “Allah tərəfindəndir!” - deyə cavab verərdi. Həqiqətən, Allah istədiyi şəxsə hədsiz ruzi verər!**".[28] Haqqın divanında duran, rüku, səcdə edən Məryəm Allah-Təalanın bərəkəti ilə dünya qadınlarından üstün qılındı. Sonra dünyada da, axirətdə də etibarlı və Allaha çox yaxın olan bir oğulla İsa Məsih ilə müjdələndi. Mələk müjdəni gətirdikdə (Məryəm) dedi: "**Ey Rəbbim! Mənə bir insan toxunmadığı bir halda necə övladım ola bilər?** "**(Allah) dedi:** "**Allah beləcə istədiyini yaradır. O, bir işin olmasını istədikdə ona ancaq Ol! deyir, o da olur**"**.**[29] Onun əmri o dərəcə müzakirəsiz və təxirə salınmazdır ki, Quranın ifadəsi ilə, Biz bircə dəfə əmr edirik, o da bir göz qırpımında yerinə yetir.[30]

---

26. Ali-İmran, 3/36.
27. İbn Kəsir, *Muxtasaru Təfsiri İbn Kəsir,* (İxtisar edən. Muhamməd Əli Sabuni), I, s, 279.
28. Ali-İmran, 3/37.
29. Ali-İmran, 3/47.
30. Qamər, 54/50.

## Ən iffətli qadına ən iffətsiz isnad

Bakirə Məryəm insanların ayıblamasından çəkindiyi üçün hamiləlik dövrünü qövmündən uzaq bölgələrdə keçirdi. Uca Allah bu mövzu barəsində Qurani-Kərimdə belə buyurur: "**Doğuş sancısı onu bir xurma ağacının gövdəsinə söykənməyə məcbur etdi. (Məryəm uşaq anadan olandan sonra atası bilinmədiyi üçün cahil insanların dedi-qodusuna səbəb olacağından əndişəyə düşüb) dedi: "Kaş ki, mən bundan əvvəl ölüb qurtaraydım və ya tamamilə unudulub getmiş olaydım!**"[31] **(Məryəm) uşağı götürüb öz adamlarının yanına gəldi. Onlar dedilər: "Ey Məryəm! Sən çox əcaib bir şeylə (atasız uşaqla) gəldin! (Və ya çox çirkin bir iş gördün!).**[32] "Məryəm bu barədə onlarla danışmağı artıq hesab etdi. Uşağına işarə etməklə kifayətləndi. Qundaqdakı bir uşağın danışmayacağına inanan xalq bu halıyla Məryəmin özlərilə lağ etdiyini düşündülər: (Məryəm) ona işarə etdi. Onlar dedilər: "**Beşikdə olan körpə ilə necə danışaq?**".[33] Qundaqda anasının sinəsindən süd əmən İsa qövmünün sayıqlamalarını eşidəndə südü tərk etdi, işarə barmağını qaldıraraq (Körpə) (dil açıb) dedi: "**Həqiqətən də, mən Allahın quluyam!".**[34] Qundaqdakı uşağın ilk nitqi Allaha qul olduğunu etiraf etmək oldu. Onun çıxışı anasını zinadan, Allah-Təalanı da şirk iddiasından tənzih etdi. O bu bəyanı ilə göyə yüksəldilməsindən sonra öz haqqında ifrata çıxan xristianları da rədd edirdi.[35]

Pak ananın uşağı nə üçün yaradıldığını, vəzifəsinin nə olduğunu ifadə edərkən də belə demişdi: "**O (Allah) mənə Kitabı (İncili) verdi və məni peyğəmbər etdi**".[36]

31. Məryəm, 19/23.
32. Məryəm, 19/27.
33. Məryəm, 19/29.
34. Məryəm, 19/30.
35. Qurtubi, XI, s, 69.
36. Məryəm, 19/30.

İman edənlərlə inkar edənlərin haqqında ixtilaf etdiyi Hz. İsa budur. Yəni Allahın qulu və Nəbisidir.[37] İsa Məsih ancaq Məryəmin oğludur ayəsi isə bütün qapıları bağlayır.

## İfrat və təfrit arasındakı həqiqət: İsa qul və rəsuldur

Anasının qucağında həqiqəti söyləyən İsa İsrail oğullarını heyrətə saldı. Nə deyəcəklərini, nə cavab verəcəklərini bilmədilər. Fərqli fikirlər irəli sürdülər. Təriqətlərə bölündülər. Yəhudilərin çoxu İsa, "vələdi-zinadır" dedi.[38] Xristianlar da ixtilafa düşdülər: Kimi "ilahdır" kimi "üç tanrının üçüncüsüdür" iddiasını irəli sürdü. Muvahhid isə, "İsa Allahın qulu və Rəsuludur" deyərək həqiqəti doğru anlayan tək camaat oldu.[39] Hz. İsaya "vələdi-zina" deyən yəhudilər və ilahlıq isnad edən xristianlar həddi aşdılar. Həqiqət budur ki, bu mövzuda ifrat da təfrit də səhvdir və küfrdür.[40]

## Dəvətə həsr edilən ömür

Hz. İsa yaradılış qayəsini yerinə yetirərək dövrünün şahidlərinə Allahın əmrlərini təbliğ etdi. Qövmünü Allah-Təalaya ibadətə dəvət etdi. **(İsa dedi:) "Həqiqətən, Allah həm mənim Rəbbim, həm də sizin Rəbbinizdir. Elə isə yalnız Ona ibadət edin! Düz yol da budur"**[41] dedi. Hz. İsaya tabe olanlar hidayətə çatdı. Müxalifət edənlər isə dəlalətə batdı.[42] Hz. İsa ömrünü Allah-Təalanın birliyini izah etməyə həsr etdi. İnsanları yalnız ona ibadət etməyə çağırdı. Onun xaricindəki hər şeyin məxluq olduğunu, buna görə

37. İbn Kəsir, *Muxtasaru Təfsiri İbn Kəsir,* (İxtisar edən. Muhamməd Əli Sabuni), II, s, 451.
38. İbn Kəsir, *Muxtasaru Təfsiri İbn Kəsir,* (İxtisar edən. Muhamməd Əli Sabuni), II, s, 451.
39. Muhamməd b. Muslihiddin Mustafa əl-Kocəvi, *Həşiyətu Muhyiddin Şeyxzadə alə Təfsiril-Qadı əl-Beydavi,* V, s, 550.
40. Qurtubi, VI, s, 16.
41. Məryəm, 19/36.
42. İbn Kəsir, *Muxtasaru Təfsiri İbn Kəsir,* (İxtisar edən. Muhamməd Əli Sabuni), II, s, 451.

onlara ibadət etməyin şirk məzmununda qiymətləndiriləcəyini dedi: "**Şübhəsiz ki, Allah Məryəm oğlu Məsihdir" deyənlər artıq kafir oldular. Məsih isə demişdir: "Ey İsrail oğulları! Rəbbim və Rəbbiniz olan Allaha ibadət edin! Həqiqətən də, Allaha şərik qoşan kimsəyə, Allah Cənnəti haram etmiş və onun sığınacağı yer oddur. Zalımlara kömək edən olmayacaqdır**".[43] Hz. İsa dəvət tapşırığını yerinə yetirərkən abid bir qul olmağı düşünürdü. Özü ilə İsrail oğulları arasında heç bir fərq görmürdü.[44] Çünki onlar kimi İsa da bir qul idi. Qulun Allah-Təalaya ibadət etməsindən daha təbii bir şey ola bilməzdi.

İsrail oğullarının inkar tufanına qarşı Allah-Təala Hz. İsanı möcüzələrlə təsdiq etdi. Allahın izni ilə palçıqdan quşa bənzər bir surət meydana gətirdi, ona üfürdü və şəkil quş surətində canlandı. Doğuşdan kor və alaca xəstəsini yaxşılaşdırdı. Ölülərə həyat bəxş etdi. İsrail oğulları bu açıq-aşkar möcüzələr qarşısında iman etmək bir yana onu sehrbaz adlandırdılar.[45] Hz. İsa İsrail oğullarının son peyğəmbəri olaraq insanlığın son Peyğəmbəri Hz. Muhammədin ﷺ gələcəyini də müjdələdi. Bir zaman Məryəm oğlu İsa demişdi: "**Ey İsrail oğulları! Həqiqətən, mən Allahın sizə göndərdiyi, məndən əvvəl (nazil edilmiş) Tövratı təsdiqləyən və məndən sonra gələcək Əhməd adlı elçisi ilə (sizi) müjdələyən bir elçisiyəm!" (Allahın elçisi) onlara açıq-aydın dəlillər gətirdikdə onlar: "Bu, aşkar bir sehrdir!**" dedilər.[46] Bütün peyğəmbərlər Allah-Təalaya həmd edirlər. Lakin Hz. İsa, yaxud Hz. Muhamməd "Rəbbinə ən çox həmd edəndir.[47] Buna görə peyğəmbərlər ehramının zirvəsində o vardı. İsa da onu xəbər verir, bir mənada dünyanı onun gəlişinə hazırlayırdı. Çünki O "Əzəldə səbəb əbədi də nəticə idi". İsrail oğulları Hz. İsanın bütün möcüzələrini sehr

43. Maidə, 5/72.
44. Zəməxşəri, *əl-Kəşşaf an Haqaiqit-Tənzil və Uyunil-Əqavil,* I, s, 634.
45. Muhamməd Əli Sabuni, *Safvətut-Təfasir,* I, s, 373.
46. Saff, 61/6.
47. Əhməd və Muhamməd adlarının detalları üçün baxın. Qurtubi, XVIII, s, 55.

adlandırdılar. Onu öldürməyə belə təşəbbüs etdilər. Lakin Allah-Təala Hz. İsanı yəhudilərin hücumundan qorudu.[48] Onu öldürə bilmədilər. Ona bənzədilən bir nəfəri İsa zənn edərək çarmıxa çəkdilər. Uca Allah Hz. İsanı göyə qaldırdı.[49] Qiyamət ərəfəsində Hz. İsa təkrar yer üzünə gələcək. Bu dəfəki gəlişində peyğəmbər olaraq gəlməyəcək.

Gələcəyini müjdələdiyi Muhammədin dinini təbliğ edəcək. Bu gəlişi ilə həm də yəhudilərin "öldürdük" yalanını təkzib, xristianların ilahlıq isnadlarını rədd edəcək. Peyğəmbərlər təbliğ vəzifəsini yerinə yetirərkən bir çox çətinliklərlə qarşılaşıblar. Onları dəli, sehrbaz, kahin adlandırıblar. Böhtanlara məruz qalıblar. Əzab görüb, daşlanıb, qırmanclanıblar. Hz. İsa da çətinliklərə məruz qaldı. Nəticədə o da dünyadan ayrıldı. Lakin Hz. İsanın ayrılması, gəlişi kimi möcüzəvi oldu. Bütün peyğəmbərlər ölümü dadıb, ruhları ilə səmaya yüksələrkən o olduğu kimi səmaya qaldırıldı. İndi məqalənin əsl mövzusuna, yəni Hz. İsanın yer üzündən ayrılışı, sonra da təkrar dönüşü ilə əlaqəli ayələrin tarix boyu alimlər tərəfindən necə izah edildiyinə baxaq: Hz. İsanın yer üzündən ayrılışını ifadə edən "təvəffa" sözü "vəfa" məsdərindən törəyən "təfəul" babındadır. Sözü yerinə yetirmək[50] ehtiyacı qarşılamaq kimi mənalara gələn bu söz, əsas etibarilə "bir şeyi tam etmək" deməkdir. Bir malı və ya başqa bir şeyi tamamilə almağa da "təvəffa" deyilir.[51] Zəməxşərinin "Əsasul-bəlağa" da bəyan etdiyi kimi "təvəffa" sözü daha sonra məcazi "öldürmək" mənasında da istifadə edilmişdir.[52] "Təvəffa" sözü Qurani-Kərimdə Hz. İsa ilə əlaqədar "mutəvəffikə" və "təvəffəytəni"[53] şəklində iki ayrı yerdə istifadə edilmişdir. İndi bu sözləri təfsirçilərin necə anladığına nəzər salaq.

---

48. Maidə, 5/110.
49. Nisa, 4/157-158.
50. Məcduddin Muhamməd b. Yəqub Firuzabadi, *əl-Qamusul-Muhid,* IV, s, 462.
51. Əbul-Fədl Cəməluddin Muhamməd İbn Mənzur, *Lisənul-Ərəb,* Darul Kutubil-İlmiyyə, XV, s, 400.
52. Zəməxşəri, *Əsasul-Bəlağa,* Darul-Fikr, s, 684.
53. Ali-İmran, 3/55; Maidə, 5/117.

Alimlərin əksəriyyətinə görə ayələrdəki “təvəffa" sözü, təslim almaq mənasındadır. Çünki “təvəffa” sözünün əsl mənası bir şeyi tamamilə almaq deməkdir. Buna görə təvəffanın məcazi "ölüm" mənasında işlədildiyini iddia etmək doğru deyil. Çünki burada məcazi mənanın alınmasına dair bir dəlil mövcud deyil. Necə ki, Qurtubiyə görə Allah-Təala, Hz. İsanı yatırmadan və öldürmədən göyə yüksəltmişdir. Səhih olan da budur. Təbəri də bu fikri seçmişdir. Abdullah b. Abbasdan rəvayət edilən ən səhih görüş də bu şəkildədir.[54]

İbn Cərir, “təvəffa” sözünün təfsiri ilə əlaqəli “yatırtmaq”, “ölmədən bədəniylə geri almaq" və "canını almaq" şəklindəki rəvayətləri verdikdən sonra belə deyir: "Bu mənaların ən doğrusu; "Səni yer üzündən alacaq və qatıma qaldıracağam" şəklində verilən mənadır. İbn Cərir bu mənanı mənimsəməsinə səbəb olaraq Hz. İsanın nüzulu ilə əlaqəli hədislərin mütəvatirliyini göstərir.[55]

Əbu Həyyan; “Həsən Bəsri, Dahhaq, İbn Zeyd, İbn Cüreyc və Muhamməd b. Cəfər b. Zübeyrin də bu qənaəti paylaşdıqlarını" bəyan edir.[56] Mutəaxxirunun öndərlərindən Əllamə Alusi, seçimə layiq olan təfsirin Hz. İsanın ölmədən və yatmadan göyə qaldırılmış olmasıdır[57] tərzindəki təfsir olduğunu deyir.

## Rabi bin Ənəsə görə

Rəbi b. Ənəsə görə "təvəffa” sözü “yuxu” halında ikən alınma mənasındadır.[58] Necə ki, Uca Allah "**Gecələr sizi yatızdıran, gündüzlər isə nələr etdiyinizi bilən Odur**"[59] buyurmaqdadır.

---

54. Qurtubi, IV, s, 65.
55. Kövsəri, *Nəzratun Əbirə fi Məzaimi mən Yunkiru Nuzulə İsa Qabləl-Əxirə,* s, 98.
56. Muhamməd b. Yusuf Əbu Həyyan, *əl-Bəhrul-Muhit,* II, s, 497.
57. Əbul-Fədl Şihəbuddin Mahmud Alusi, *Ruhul-Məani,* III, s, 179.
58. Qurtubi, *e. a. ə.,* IV, s, 65; Əbu Həyyan, *e. a. ə.,* II, s, 497; İbn Kəsir, *e. a. ə.,* I, s, 286; Alusi, *e. a. ə.,* III, s, 179.
59. Ənam, 6/60.

İbn Abbas da, yuxuda ikən ruhlar alınır deyir.[60] Buna görə ayədəki "yətəvəffəkum" sözü "yunimukum (sizi yatırır) mənasındadır. Çünki ölüm yuxunun qardaşıdır. Necə ki, Allah Rəsuluna ﷺ "Cənnətdə yuxu var mı?" deyə soruşulduqda; "Xeyr! Yuxu ölümün qardaşıdır. Cənnət isə, ölümün olmadığı yerdir", - buyurmuşdur.[61]

"İnni mutəvəffəkə" ifadəsi "səni yatırdacağam" yəni bu halda səmaya tərəf qaldıracağam şəklində olsa yuxuda ikən göyə çıxarılan Hz. İsa, qorxu bilməz və oyandıqda özünü səmada təhlükəsizlikdə tapardı. Necə ki, Rəbi ibn Ənəs də Hz. İsanın bu halda yer üzündən alınmasını Allah-Təlanın ona olan şəfqətinə bağlayır".[62]

"Təvəffa" sözü necə təfsir edilirsə edilsin, ondan sonra gələn "və rafiukə iləyyə (səni qatıma qaldıracağam) qeydi ilə fiziki bir yüksəliş olduğu aydın olur. Çünki adı çəkilən ifadə üsulçuların diliylə "nəssdir". Yəni şəxsən fiziki yüksəlişi ifadə etmək üçün işlədilmişdir.

Çünki "rafiukədən sonra gələn "ilə" artiklı sözün "adamın məqam və mövqeyini yüksəltmək" kimi məcazi mənalarını olmadığını bildirir. Eynilə "qanadlarıyla uçan" ifadəsindəki "qanad" sözünün "uçan" varlığın məcazən bu hərəkəti işlədiyini anlamağa mane olması kimidir.[63] "Təvəffa" sözünün "yatırtmaq" şəklində başa düşülməsi də Hz. İsanın göyə çıxarılışını təsdiq etməkdədir.

"Təvəffa" sözünün "yatırtmaq" şəklində başa düşülməsi də Hz. İsanın göyə çıxarılışını təsdiq etməkdədir. Necə ki, "təvəffa" sözünü bu şəkildə təfsir edən Rəbi səmaya yüksəlmənin ruh və bədənlə olduğunu qəbul edir.[64]

---

60. Sabuni, *e. a. ə.,* I, s, 395.
61. Qurtubi, *e. a. ə.,* IV, s, 65; Alusi, *e. a. ə.,* III, s, 179.
62. Alusi, *e. a. ə.,* III, s, 179.
63. Kövsəri, *e. a. ə.,* s, 96.
64. Alusi, *e. a. ə.,* III, s, 179.

## Vəhb bin Munəbbihin təfsiri

Vəhb b. Munəbbih, "mutəvəffikə" sözünün "ölüm (məvt) ruhun bədəndən ayrılması" mənasında olduğunu deyir. Bu görüşə görə; Allah-Təala Hz. İsanı dünyada ikən öldürdü sonra üç saat qədər yerdə buraxdı və bu halda yüksəldib səmada diriltdi.[65]

Alusi, Vəhb b. Munəbbihə aid bu təfsiri verdikdən sonra seçimə layiq olanın Hz. İsanın ölmədən göyə yüksəldildiyini izah edən görüş olduğunu bəyan edir. Çünki bir çox mənaya gələn "təvəffa" sözünü məcazi (ölüm) mənada istifadə etmək üçün dəlil tələb olunur. Belə bir dəlil isə yoxdur. Əksi haqqında dəlillər mövcuddur. Bu vəziyyətdə Vəhb b. Munəbbihin təfsiri keçərli deyil. Onsuz da Zahid Kövsəri, Vəhb b. Münəbbihin bu görüşü əhli-kitabdan nəql etdiyini bəyan edir.[66]

Necə ki, Zəhəbi, Vəhbdən "İsrailiyyat" məlumatının çox olduğunu nəql etmişdir.[67] Bu səbəbdəndir ki; Buxari və Müslim sənədində Vəhbin olduğu yalnız bir hədisi əsərlərinə almışlardır.[68] Bütün bu mülahizələr Vəhb b. Munəbbihin görüşünün nə üçün "şaz" olduğunu göstərməyə kafidir.

Vəhb b. Munəbbihin görüşü seçim edilsə belə bu, Hz. İsanın nüzuluna müxalif olmaz. Çünki Vəhb, Hz. İsanın səmada diri olduğuna və yenidən yer üzünə gələcəyinə inanır.

## Yaxın dövr təfsirçilərinə görə

Hz. İsanın öldüyü üçün təkrar yer üzünə gəlməyinin mümkün olmadığını müdafiə edən görüş, yaxın dövr təfsirçilərinə aiddir. Necə ki, Muhamməd Abduh və tələbəsi Rəşid Rza "Təvəffa" sözündən ilk ağla gələn mənanın Hz. İsanın Allah-Təala tərəfindən öldürülüb mənən yüksəldilməsi olduğunu söyləməkdədir.[69]

---

65. Əbu Həyyan, *e. a. ə.,* II, s, 497; Alusi, *e. a. ə.,* III, s, 179.
66. Kövsəri, *e. a. ə.,* s, 131.
67. İmam Zəhəbi, *Siyəru Aləmin-Nubələ,* IV, s, 545.
68. İmam Zəhəbi, *e. a. ə.,* IV, s, 556.
69. Muhamməd Rəşid Rıza, *Təfsirul-Quranil-Hakim,* III, s, 261.

Adı çəkilən iki şəxsin anlayış üsulunu mənimsəyən Mahmud Şəltut da hocalarını təsbit edən bir fitva vermişdir. Şəltut fitvasında Hz. İsanın öldüyünü yer üzünə təkrar gəlməyəcəyini müdafiə edir.[70]

"Təvəffa" sözü əvvəl "bir şeyi tam olaraq almaq" mənasında işlədilirdi. Necə ki, Rəşid Rza da "Təvəffa" sözünü təfsir edərkən bunu etiraf edir. Lakin sonra niyəsə "təvəffadan" ağla ilk gələn mənanın ölüm olduğu iddiasını irəli sürür.

Modernist təfsirçilərin sözü gedən kəlməni "ölüm" olaraq təfsir etmələri sözün bu gün qazandığı mənasına görədir. Sözün bu gün "ölüm" mənasında işlənməsi, Quranın endiyi dövrdə səhabələrin danışıq dilində də eyni mənanın olması demək deyil. Əgər "təvəffa" sözünə müasir təfsirçilər kimi "ölüm" mənası verilsə o zaman "Allahu yətəvəffəl-ənfusə hinə məvtihə"; (Allah ölənlərin canını ölüm anında, ölməyənlərin canını isə onlar yuxuda ikən) (təvəffa)[71] ayəsindəki "öldükləri sırada" (hinə məvtihə) ifadəsi səhv olardı. Allah-Təalanın kəlamı isə səhvdən uzaqdır. Yuxarıdakı ayədə Allah-Təala yatanın da, ölənin də ruhunu aldığını ifadə edərkən "təvəffa" felindən istifadə edir.

Halbuki yatan ölməməkdə, əcəli gələnə qədər yaşamaqdadır. Buna görə, "təvəffa" sözünün ağla ilk gələn mənası ölümdür demək doğru olmaz. Ayrıca Qurani-Kərimin doğru anlamağın yolu, nazil olduğu dövrün ünsiyyət dilini nəzərə almaqdan keçir.[72] Bu günün danışıq dilini istinad qəbul edib ayələri təfsir etmək olmaz.

Hadisənin necə ciddi səhvlərə səbəb olduğunu daha yaxından görə bilmək üçün belə bir nümunə verə bilərik: "Bu gün tələbənin diplom ala bilmək üçün universitetə verdiyi orijinal araşdırmaya "risalət" deyilməkdədir. Bu yoldan hərəkətlə Kitab və Sünnədə varid olan "risalətə də "xüsusi araşdırma" mənası verilsə, Allah-Təaladan gələn "vəhy" və

---

70. Kövsəri, *e. a. ə.,* (Şəltətun fitvası üçün baxın. s, 23-31), s, 29-30.
71. Zumər, 39/42.
72. Kövsəri, *e. a. ə.,* s, 99-100.

rükətlərində, nə də rükunun və səcdənin formasında ixtilaf etmişdir. Yalnız bu xüsus belə Sünnəni bölən deyil, birləşdirən olduğuna misal olmağa kafidir. Kilsə bunun üçün Qurani-Kərimlə Sünnə üzərindən mübarizə aparmışdır. Əgər Quranın “Namaz qılın!” buyruğunun necə başa düşülməsi lazım olduğunu Allah Rəsulu ﷺ ümmətinə göstərməsəydi, bu gün hər kəsin istəyinə görə bir "namaz" forması olacaqdı.

Kimi salatdan (namazdan) dua etməyi, kimi mücərrəd bir halda Allaha yönəlməyi anlayacaq, kimi namazı ayaqda, kimi oturaraq başlayacaq; kimi hər rükətdə bir səcdə, kimi üç səcdə edəcək, kimi fərzləri bir, kimi iki rükət qılacaqdı. Lakin Allah azzə və cəllə qullarına rəhmət etdi. Peyğəmbəri göndərdi, O da Sünnə ilə İslamı dərin ixtilaflara düşməkdən qorudu.

## Xülasə:

Çakraləvi Quraniliyin əməntusunu, ingilislərdən həm təlimat, həm də nişan alan Seyyid Əhməd xandan aldı. Buna görə Quranilərin bir qismi birbaşa, bir qismi də bilavasitə Kilsəyə xidmət etməkdədir. Bizdəki Quranilərin hər nə iddiaları varsa, hamısı Hindistanda zühur edən Quraniyyun hərəkatına aiddir. Buna görə hadisəni muqəllidlər üzərindən deyil, ingilislərin AR-GEsində işləyən Çakraləvi kimi "ixtiraçılar" məzmununda təhlil etdim.

Quranilik Allah Rəsuluna ﷺ dəli deyən, insanları Ondan uzaqlaşdırmaq üçün Ona dair hər növ yalanı uydurmağı vəzifə qəbul edən, nəşini qəbrindən çıxarmaq üçün xüsusi adamlar göndərən, lakin hər dəfə istədiyinə nail ola bilməyən kilsənin aktyorlarından müsəlmanlar arasından seçdiyi ən son və ən təhlükəli oyundur.

## Mündəricat